*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 70, №2, səh. 185-189 (2015)*

# MUSTAFA BƏY TOPÇUBAŞOV – 120

## Virtuoz Cərrah, Görkəmli Dövlət Və Elm Xadimi



***Avqustun 5-də Azərbaycanda tibb elminin inkişafında misilsiz xidmətlər göstərmiş görkəmli alim, ictimai xadim, Azərbaycan Milli Elmlər Akademiyasının təsisçilərindən biri, akademik Mustafa bəy Ağabəy oğlu Topçubaşovun anadan olmasının 120 ili tamam olur. Heyrətamiz istedadı, böyük entuziazmı, tükənməz enerjisi, yüksək intellekti, məntiqi təfəkkürü və iti zəkası hesabına cərrahiyyə sahəsində bir sıra ixtira və kəşfləri, möhtəşəm fəaliyyəti ilə Azərbaycana başucalığı gətirən, dərin insani keyfiyyətləri, ürəyinin sevgisi və skalpelinin sehri ilə apardığı yüz mindən artıq cərrahi əməliyyatlar nəticəsində insanlara sağlamlıq bəxş edən dünya şöhrətli alimin yubileyi ölkəmizdə geniş qeyd edilir. Virtuoz cərrah, görkəmli dövlət və elm xadimi Mustafa bəyin əziz xatirəsi dövlətimiz və xalqımız tərəfindən daima hörmətlə anılır.***

1995-ci il oktyabr ayının 14-də Heydər Əliyevin 31 iyul 1995-ci il tarixli sərəncamı ilə Azərbaycan Dövlət Opera və Balet Teatrında akademik Mustafa bəy Topçubaşovun anadan olmasının 100 illik yubileyi qeyd olunarkən Ümummilli liderimiz öz çıxışında demişdir: ***"Mustafa bəy Topçubaşovun həyat yolu, yaradıcılığı, onun bizim üçün və gələcək nəsillər üçün qoyduğu irs milli sərvətimiz və milli iftixarımızdır".*** Bu fikirlərdə akademik M.Topçubaşov şəxsiyyətinə Azərbaycan dövlətinin göstərdiyi böyük ehtiram oz möhtəşəm ifadəsini tapmışdır.

Akademik M.Topçubaşov AMEA-nın ilk təsisçilərindən, onun ilk həqiqi üzvlərindən biri olmaqla, şərəfli ömrünün 36 ildən artıq bir dövrünü Azərbaycan Milli Elmlər Akademiyası kimi möhtəşəm elm məbədinin inkişafına və bərqərar olmasına, 62 ildən çoxunu - cərrahlıq elminin tərəqqisinə, 51 ildən çoxunu isə - Azərbaycan Tibb Universitetinin fakültə cərrahlığı kafedrasının təşəkkül tapmasına, elmi-pedaqoji işlərin, tibb elmi və tibb təhsili sistemlərinin, bütövlükdə Azərbaycan səhiyyə sisteminin təkmilləşməsinə, gənc milli tibb kadrlarının hazırlanmasına, onların təkmil mütəxəssis kimi yetişmələrinə həsr edibdir. Səhiyyənin maddi-texniki bazasının möhkəmləndirilməsində, tibb təhsilinin tədrisində, müalicə və profilaktika sahəsində mühüm islahatların həyata keçirilməsində də görkəmli alim misilsiz xidmətlər göstərmişdir.

Mustafa bəy Ağabəy oğlu Topçubaşov 1895-ci il avqust ayının 5-də İrəvan şəhəri yaxınlığında Göykümbət kəndində dünyaya gəlib. İbtidai və gimnaziya təhsilini İrəvanda başa vurub. Uşaqlıq dostu, gələcəyin görkəmli dövlət və elm xadimi Əziz Əliyevlə eyni ibtidai məktəbdə, eyni gimnaziyada təhsil alıb. O vaxtlar İrəvan ibtidai məktəbi və gimnaziyasının təşkilində azərbaycanlı müəllimlərin böyük rolu olub.

1914-cü ildə İrəvan gimnaziyasını bitirən M.Topçubaşov Kiyev Universitetinin tibb fakültəsinə daxil olub. 1919-cu ildə təhsilini müvəffəqiyyətlə başa vurduqdan sonra, universitetin kafedralarının birində fəaliyyətini davam etdirmək təklifi edilməsinə baxmayaraq, Bakıya qayıdıb.

O vaxt Azərbaycanda Xalq Cümhuriyyəti yaradılmışdı. 1919-cu il sentyabrın 1-də yenicə müstəqillik əldə etmiş ölkəmizin paytaxtında Bakı Dövlət Universitetinin (BDU) tibb fakültəsi təşkil edilmişdi. Ölkənin səhiyyə xidmətində ciddi problemlərin mövcudluğu, xüsusən də milli həkim kadrlarına böyük ehtiyac olduğu bir vəziyyətdə M.Topçubaşovun vətənə qayıtması, BDU-nun tibb fakültəsinin cərrahiyyə kafedrasında çalışan professor A.Oşmanı və universitetin rektoru, görkəmli cərrah-anatom professor V.Razumovskini məmnun etmişdi. M.Topçubaşovun BDU-nun tibb fakültəsinin cərrahiyyə kafedrasında ordinator kimi işə düzəlməsində bu alimlərin böyük rolu olmuşdu. Mustafa bəy BDU-nun tibb fakültəsində cərrahlıq fənnindən dərs deməyə

cəlb edilən ilk milli kadrlardan olub. O, ordinator işləməklə yanaşı, Azərbaycan Səhiyyə Komissarlığının Cərrahlıq Xəstəxanasının müdiri vəzifəsində çalışıb. Tez-tez respublikanın ucqar rayonlarına gedərək, yerlərdə cərrahi şöbələr təşkil edib, ambulatoriya və stasionaraqədərki cərrahi yardımın mexanizmini qurub, əhaliyə yüksəkixtisaslı həkim yardımı göstərib. M.Topçubaşov 1922-ci ildə Nəriman Nərimanovun təklifi ilə Naxçıvana göndərilib. O, Naxçıvanda xəstəxana, ambulatoriya, Ordubadda feldşer məntəqələri təşkil edib. Akademik sonralar xatirələrində o illəri belə təsvir edirdi: *"İş vaxtımın başlanğıcı və sonu yox idi. Gündüzün və gecənin nə vaxtı olursa-olsun xəstə gətirirdilər, yaxud xəstə üstə çağırırdılar. Mən həm terapevt, həm cərrah, həm nevropatoloq, həm epidemioloq, həm vərəm həkimi, həm yoluxucu xəstəliklər həkimi... işləyirdim. Həkimsən, demək loğmansan, bütün dərdlərə əlac qılmalısan".*

Gənc həkim-cərrahın adı respublikada qısa müddətdə məhşurlaşıb və xalq arasında "Topçubaşov skalpeli" məfhumu yaranıb. 1923-1927-ci illərdə professor A.Oşmanın təqdimatı ilə əsasən neftçilərə xidmət edən və Bayılda yerləşən Paster adına xəstəxananın cərrahlıq şöbəsinin və eyni zamanda Azərbaycan SSR Xalq Səhiyyə Komissarlığı Cərrahlıq Xəstəxanasının müdiri təyin edilib.

Azərbaycanda sovet hakimiyyətinin ilk illərində səpgili yatalaq, qarın yatalağı, malyariya, traxoma kimi infeksion xəstəliklər əhali üçün ciddi təhlükə törədirdi. Bununla əlaqədar olaraq, 1925-ci ilin iyul ayında Azərbaycan hökuməti "Azərbaycan SSR-də qızdırmaya qarşı mübarizə" haqqında qərar qəbul etdi. Bundan sonra M.Topçubaşov elmi-tədqiqat işlərini qızdırmanın profilaktikası işinə yönəltdi.

M.Topçubaşov 1925-ci ildə Tiflisdə keçirilən Zaqafqaziya Cərrahlarının I Qurultayında "Exinokokkun cərrahi müalicəsi" və "Qalxanabənzər vəzin köçürülməsi" mövzularında çıxışlar edib və mövzulara aid ilk elmi məqalələrini Qurultayın materiallarında çap etdirib.

1926-cı ildə Mərkəzi Komitə Azərbaycanda "Həkimlərin nəzəri və təcrübi hazırlığını yaxşılaşdırmaq haqqında" adlı xüsusi qərar qəbul edib və Azərbaycan Xalq Maarif Komissarlığı tibbi təcrübə keçmək üçün Almaniyaya 20 nəfər həkim göndərilməsi qeyd edilib. Almaniyaya gedənlərin siyahısına M.Topçubaşovun adı salınmayıb və buna əsas səbəb komissarlığın kollegiya iclasında Mustafa bəyin namizədliyi irəli sürüləndə hamının yekdilliklə dediyi fikir olub "Mustafa Topçubaşov artıq özü öyrədir. Öyrənməyə ehtiyacı olanları göndərmək lazımdır". Almaniyaya göndərilən 20 nəfər həkimdən 8-i bu səfərdən imtina etdiyindən, M.Topçubaşov ərizə yazaraq onun namizədliyinin irəli sürülməsini xahiş edib. Müvafiq orqanlarla məsləhətləşdikdən sonra onun da adı siyahıya salınıb. Beləliklə, M.Topçubaşovla birlikdə gələcəkdə Azərbaycan Elmlər Akademiyasının ilk prezidenti olmuş, akademik Mirqasımov və digər həkimlər Almaniyanın Berlin, Münhen, Leypsiq və digər şəhərlərində təkmilləşmədə olublar. Mustafa bəy Almaniya təəssüratı haqqında yazırdı: *"Professor Krause çox hörmətli mütəxəssis idi. Həddən ziyadə tələbkar olduğu üçün onunla işləmək çox çətin idi. Professorun qohumlarından biri yol qəzasına düşmüşdü. Onu ağır vəziyyətdə klinikaya gətirmişdilər. Təcili qan köçürülməli idi. Həmin xəstəyə eyni qan qrupu olduğu üçün mənim qanımın köçürülməsinə razılıq verdim. Şahidlər deyirdilər ki, professor Krause bu nəcibliyə heyran qalmışdı. Həmin əhvalatdan sonra professor Krause ilə mənim aramda xoş ünsiyyət yaranmışdı".*

M.Topçubaşov təkcə öz skalpelinin gücü, qüdrəti ilə deyil, lazım gəldikdə, həm də donor kimi xeyirxahlığı ilə də insanları ölümün pəncəsindən qurtarmağı bacarırdı və bunun bir nümunəsi vətəndən uzaqlarda – Almaniyada baş verdi. Bu əhvalatdan sonra professor Krause azərbaycanlı həkimlərə müraciətlə demişdi: *"Əgər Azərbaycanın indi sizin kimi yüz oğlu varsa, yarım əsrdən sonra yüz professoru olacaqdır. Mən bütün varlığımla buna inanıram".*

Alman alimi professor Krauzenin inamı doğruldu. Azərbaycan həkimləri Bakıya qayıtdıqdan sonra Almaniyada əldə etdikləri mükəmməl təcrübə onların hər birinin gələcək fəaliyyət yollarında geniş imkanlar açdı. M.Topçubaşov Almaniyadan qayıtdıqdan sonra şəhər xəstəxanalarından birində cərrahi yardım göstərən ilk elmi-metodik mərkəz yaratdı.

O, 1930-cu ildə «Malyariya mənşəli splenomeqaliyanın klinikası, patogenezi və cərrahi müalicəsi» mövzusunda doktorluq dissertasiyası müdafiə edib, tibb elmləri doktoru elmi dərəcəsi və professor elmi adına layiq görülüb. Bundan sonra gənc alim Azərbaycan Tibb İnstitutunun (ATİ) Fakültə cərrahlığı kafedrasının müdiri seçilərək, ömrünün sonuna qədər (1981-ci il) həmin vəzifəni şərəflə yerinə yetirib.

M.Topçubaşov uzun müddət cərrahi ağrısızlaşdırma problemi üzərində işləyib və nəhayət, istədiyinə nail olub. Bu sahədə apardığı elmi axtarışlar 1937-ci ildə ona cərrahlıq praktikasına yeni, nisbətən təhlükəsiz keyləşdirmə metodunu – "Analgezin" adlanan inyeksion efir-yağ narkozunu daxil etməyə imkan verib. Bu metod sadəliyinə, hazırlanma və tətbiq texnikasının asanlığına, inhalyasion narkoz zamanı rast gəlinən bir sıra mənfi halların – dərin narkoz yuxusu, qanda narkotik maddələrin yüksək konsentrasiyada toplanması və s. halların aradan qaldırılmasına imkan verdiyinə görə, cərrahlar tərəfindən gündəlik praktikaya geniş tətbiq edilib. Təklif edilən efir-yağ qarışığı inyeksiyalarından

həm də öddaşı xəstəliyinin sancıları, travmatik şok, tetanus, qıcolma halları zamanı müalicə və eləcə də doğuş proseslərində ağrısızlaşdırma vasitəsi kimi istifadə edilib.

1945-ci ildə SSRİ Xalq Səhiyyə Komissarlığının Elmi-Tibbi Şurasının Farmakologiya Komitəsinin iclasında efir-yağ qarışığının «Analgezin» adı altında istehsal edilməsinə icazə verilib. Bu metodun kəşfi və tətbiqi ilə əlaqədar olaraq 1963-cü ildə SSRİ Tibb Elmləri Akademiyasının A.Vişnevski adına Elmi-Tədqiqat Cərrahlıq İnstitutunda keçirdiyi konfransda M.Topçubaşov öz kəşfi barədə təqdimat nitqi söyləyib və görkəmli Azərbaycan aliminin çıxışı alqışlarla qarşılanıb. Elə həmin konfransda dünya şöhrətli alim A.Vişnevski adına mükafata və diploma layiq görülüb. Leninqradda (Sankt-Peterburq) fəaliyyət göstərən akademik P.Kupriyanov M.Topçubaşovun "Analgezin" haqqındakı kəşfindən danışarkən demişdir: *"...Bakı nefti müharibə illərində tanklarımıza, təyyarələrimizə nə vermişdisə, efir-yağ narkozu da hərbi - səhra cərrahiyyəmizə onu vermişdir. Akademik M.Topçubaşovun zəhmətini başqa heç cür müqayisə etmək və qiymətləndirmək olmaz".*

Neyrofiziologiya sahəsində professor Q.Qəhrəmanovla əməkdaşlıq edən akademik M.Topçubaşov bu sahədə xeyli tədqiqat işləri aparmış, yüksək nəticələrə nail olmuşdu. Professor Q.Qəhrəmanov belə əməkdaşlığa və akademikin kəşfinin Nobel mükafatına təqdimi məsələsinə toxunaraq yazırdı: *"1977-ci ildə Beynəlxalq Nobel Mükafatları Komitəsindən Bakıya çox sevindirici bir xəbər gəldi. Bu xəbər məktub şəklində Mustafa Topçubaşova və mənim ünvanıma göndərilmişdi. Komitə təklif edirdi ki, bizə göndərdiyi anket suallarına cavab yazaraq, nəşr edilmiş elmi işlərimizin siyahısı ilə bərabər, dekabr ayından gec olmamaq şərtilə poçt vasitəsilə Komitəyə göndərək. Biz, "Davamlı analgeziya təbabətin və fiziologiyanın problemidir" adlı yenicə çapdan çıxmış kitabımızı, elmi işlərimizin siyahısı ilə bərabər Komitəyə göndərdik... Komitədən cavab aldıqdan az sonra "Bakinskiy raboçiy" qəzetinin iki nömrəsində Nobelin əleyhinə bir məqalə dərc olundu... Görünür, azərbaycanlı alimlərin Nobel mükafatı laureatları sırasına düşmək ehtimalının gerçəkləşə biləcəyi ərəfədə, Nobelin tənqid olunması təsadüfi deyildi. Bu məqalə barədə Mustafa bəy mənə dedi ki, "Söhbət təkcə bizdən getmir, ancaq çox istərdim ki, Nobel mükafatına layiq görülənlərin siyahısına azərbaycanlıların da adı düşəydi". 1978-ci ildə tibbə və fiziologiyaya nəzərdə tutulmuş mükafat heç kəsə verilmədi".* Birmənalı şəkildə demək olar ki, akademik M.Topçubaşov həqiqətən Nobel mükafatına layiq idi və məncə, əlavə şərhə ehtiyac yoxdur, çünki Azərbaycana qarşı ikili standartların tətbiqi o dövrdə də gündəmdə olub.

Böyük Vətən müharibəsi illərində (1941-1945) professor M.Topçubaşov Azərbaycan Xalq Səhiyyə Komissarlığı Evakohospital İdarəsinin baş cərrahı təyin edilib və bu işdə də özünü bacarıqlı təşkilatçı, novator-cərrah kimi göstərib. Belə ki, o, SSRİ-də ilk dəfə olaraq evakohospitalların ixtisaslaşdırılma və növbələşdirilməsinin təşəbbüskarı və yaradıcısı olub. Müharibə illərində bundan hərbi-səhra cərrahlığı işinin təşkilində müvəffəqiyyətlə istifadə olunub. Evakohospitallarda apardığı çoxsaylı əməliyyat və müşahidələr professora bir sıra səmərəli təkliflər irəli sürmək imkanı da verib. Hərbi səhra cərrahlığının ən aktual problemlərindən olan insan bədəninə daxil olmuş metal yad cismin lokalizasiyası və onun xaric edilməsi problemi üzərində çalışan alimin konstruksiyası əsasında hazırlanan stereoskop aparatı portativliyinə və yad cismin lokalizasiyasını dəqiq təyinetmə imkanına görə böyük müvəffəqiyyətlə təcrübədə tətbiq edilib. M.Topçubaşov periferik sinir zədələnmələrinin cərrahi müalicəsində mum-parafin tubajı, ətraflarda əmələ gələn və müalicəyə tabe olmayan ifliclər zamanı tendomioplastika, kəllə sümüklərinin kranioplastikası və s. kimi böyük əhəmiyyət kəsb edən orijinal təkliflərinə görə respublikadan kənarda da böyük şöhrət qazanıb. Müharibədən sonra professor M.Topçubaşov Azərbaycan SSR Səhiyyə Nazirliyinin baş cərrahı vəzifəsində çalışaraq, respublikada cərrahi xidmətin yenidən təşkilinə bilavasitə rəhbərlik edib.

1945-ci ildə respublikanın 15 nəfər görkəmli elm xadimləri sırasında Azərbaycan SSR Elmlər Akademiyasının ilk təsisçilərindən olan alim, həm də, onun ilk həqiqi üzvlərindən biri seçilib. Onun 1947-1949-cu illərdə Azərbaycan Elmi-Tədqiqat Kliniki və Eksperimental Təbabət İnstitutuna rəhbərlik etməsi, uzun illər Azərbaycan SSR Elmlər Akademiyasının vitse-prezidenti vəzifəsini yerinə yetirməsi onun təşkilatçılıq qabiliyyətinə göstərilən etimadın parlaq təzahürlərindəndir.

Akademik M.Topçubaşov beynəlxalq miqyasda əldə etdiyi yüksək səviyyəli nailiyyətlərinə, ixtira və kəşflərinin dəyərinə, səhiyyə sahəsindəki xidmətlərinə görə 1949-cu ildə SSRİ Tibb Elmləri Akademiyasının müxbir üzvü, 1960-cı ildə isə həqiqi üzvü seçilib.

Alimin elmi-tədqiqat işlərinin əsas istiqamətini malyariya mənşəli splenomeqaliyanın klinikası, patogenezi, profilaktikası və cərrahi müalicəsi, öd yolları xəstəliklərinin, xərçəng xəstəliyinin cərrahi müalicə üsullarının işlənib hazırlanması və praktikaya tətbiqi, qarın və döş boşluğu orqanlarının cərrahi əməliyyat tələb edən xəstəliklərinin diaqnostikası, klinikası, profilaktikası və cərrahi müalicəsi, neyrocərrahiyyə və travmatologiya problemləri, müasir tibbi texnologiyaların işlənib hazırlanması, əldə olunan nəticələrin səhiyyə praktikasına tətbiqi və s. təşkil edib.

Akademik M.Topçubaşov 5 cildlik «Xüsusi cərrahlıq» kitabının, 8 monoqrafiyanın, 300-dən çox çap olunmuş elmi işin və elmi-kütləvi məqalənin müəllifi olub. Onun rəhbərliyi və məsləhətçiliyi altında 42 (12 doktorluq və 30 namizədlik) dissertasiya müdafiə edilməsi, alimin milli tibb kadrları hazırlığı istiqamətində yerinə yetirdiyi titanik işlərin parlaq təcəssümünü göstərir.

O, gərgin elmi və təcrübi fəaliyyəti ilə yanaşı, geniş miqyaslı elmi-pedaqoji fəaliyyətlə məşğul olub və yüksəkixtisaslı çoxminli həkim kadrlarının hazırlanmasında böyük xidmətlər göstərib. Onun layihəsi üzrə kafedrada operasiyon - auditoriya təşkil edilib ki, bu da tələbələrə cərrahi müdaxilənin bütün detallarını izləməyə imkan verib.

Mustafa bəy urologiyada, travmatologiyada, neyrocərrahlıqda, abdominal və torakal cərrahlıqda yüksək səviyyəli operasiyaların müəllifi kimi keçmiş Sovetlər İttifaqı, eləcə də xarici ölkə cərrahları arasında layiqli şöhrət qazanıb. Onun, xüsusilə, Bolqarıstan alimləri ilə yaratdığı sıx əməkdaşlıq hər iki tərəfdən məmnunluq hissi ilə qarşılanıb. Bunun müqabilində Azərbaycan aliminin 1952-ci ildə Bolqarıstan Elmlər Akademiyasının müxbir üzvü seçilməsi bu dostluğun, bu əməkdaşlığın, bu münasibətin zirvə nöqtəsinə çevrilib. Alimin Bolqarıstanda apardığı təmənnasız mürəkkəb cərrahi əməliyyatlar ona bolqar xalqının hüsn-rəğbətini, səmimi məhəbbətini qazandırmışdır.

Cərrahların Lissabonda keçirilən XI Beynəlxalq Konqresində akademik M.Topçubaşov 20 nəfər Sovet tibb alimi ilə birlikdə Beynəlxalq Cərrahlar Assosiasiyasının üzvü seçilmişdir ki, bu da görkəmli alimin simasında dünya miqyasında Azərbaycan cərrahlıq elminə verilən ən yüksək dəyər, ən yüksək qiymətdir.

Görkəmli alim dünya miqyasında həm də görkəmli dövlət xadimi və ictimai xadim kimi tanınıb. Azərbaycan EA-nın və SSRİ TEA-nın həqiqi, Bolqarıstan EA-nın müxbir üzvü olan akademik M.Topçubaşov 30 ilə yaxın bir müddətdə Azərbaycan SSR EA-nın vitse-prezidenti, Azərbaycan SSR Ali Sovetinin sədri olub, I-X çağırışlarda Respublika Ali Sovetinə, həmçinin SSRİ Ali Sovetinə deputat seçilib, Azərbaycan Respublikası Sülhü Müdafiə Komitəsinin sədri, Ümumittifaq Sülhü Müdafiə Komitəsinin üzvü, Sovet İttifaqının Asiya və Afrika Ölkələri Xalqları ilə Həmrəylik Komitəsinin üzvü, «Böyük Tibb Ensiklopediyası»nın redaktorlarından biri və Azərbaycan Sovet Ensiklopediyası (ASE) Baş redaksiya heyətinin üzvü olub. Sülh işi uğrunda xidmətlərinə görə M.Topçubaşov Ümumdünya Sülh Şurasının gümüş medalı və Sovet Sülhü Müdafiə Komitəsinin fəxri fərmanları ilə təltif olunub. Görkəmli alim Vətən qarşısındakı xidmətlərinə görə 4 dəfə «Lenin» ordeninə, «Qırmızı Əmək Bayrağı», «Qızıl Ulduz», «Şərəf Nişanı» ordenlərinə, Bolqarıstanın III dərəcəli "Kirill və Mefodi" ordeninə, «Sosialist Əməyi Qəhrəmanı» Fəxri adına, SSRİ Dövlət (Stalin) Mükafatı Laureatına, «Oraq və Çəkic» qızıl medalına, «Qafqazın müdafiəsinə görə», «Almaniya üzərində qələbə», "Fədakar Əməyə görə" medallarına, "SSRİ Səhiyyə Əlaçısı", "SSRİ-nin Sanitar Müdafiəsi Əlaçısı" döş nişanlarına, Fəxri Fərmanlara layiq görülüb. Bakı şəhərindəki küçələrdən və Xəzərdə üzən gəmilərdən biri, Səhiyyə Nazirliyinin Elmi Cərrahiyyə Mərkəzi akademik M.Topçubaşovun adını daşıyır. Elmi-Cərrahiyyə Mərkəzinin həyətində alimin büstü qoyulub, ATU-dakı iş otağında - "Xatirə Muzeyi" təşkil edilib.

Görkəmli alim akademik M.Topçubaşov 1981-ci il noyabrın 20-də əbədiyyətə qovuşub.

M.Topçubaşov irsi, onun elmi əsərləri, kəşf və ixtiraları bütün dövrlərdə olduğu kimi, bu illərdə də müasirliyini, gələcək nəsillərə nümunə olma göstəriciliyini, bəşəriyyətə, o cümlədən vətənə və xalqa, tibb elminə və səhiyyəyə lazımlığını bütün dolğunluğu ilə mühafizə edərək saxlayıb. 1995-ci ildə M.Topçubaşovun ATİ-dəki iş otağında alimin "Xatirə Muzeyi"nin təşkili, 2010-cu ildə ATU-nun yaranmasının 80-illik yubileyi ərəfəsində alimin yazdığı 5 cildlik "Xüsusi cərrahlıq" kitabının nəfis tərtibatda yenidən nəşr edilməsi, eləcə də müxtəlif illərdə alimin yubileylərinə həsr edilmiş elmi konfransların keçirilməsi, onun barəsində mətbuatda ardıcıl yazılar dərc edilməsi, haqqında kitablar yazılıb çap etdirilməsi bu yaxınlığın, bu qayğının, M.Topçubaşov əbədiyaşarlığının bariz nümunələrindəndir.

Mustafa bəyin 100-illik yubiley tədbirində dahi Heydər Əliyev bu zərurət meyarlarını təhlil edərək Azərbaycan Milli Elmlər Akademiyasının 50 illik yubileyini də gözlərimiz önündə geniş panoramla canlandırdı və bu möhtəşəm elm məbədinin fəaliyyətini yüksək qiymətləndirərək dedi: ***"Bu il biz Azərbaycan Elmlər Akademiyasının yaranmasının 50-illik yubileyini qeyd edirik. Bu, Azərbaycan xalqının tarixində böyük bir səhifədir. Çoxəsrlik tariximizdə elmimiz, alimlərimiz olubdur. Ancaq Azərbaycan elmi heç vaxt bu qədər mütəşəkkil və bu qədər qüvvətli, güclü, çoxsahəli olmayıbdır. 50 il ərzində Azərbaycan Elmlər Akademiyası bütün elmi potensialı özündə cəmləyərək, xalqımızın elm, yaradıcılıq sahəsində nəyə qadir olduğunu dünyaya göstəribdir. Xalqımız istedadlı xalqdır, ağıllı xalqdır. Xalqımızın istedadlı, ağıllı, elmli, zəkalı olmağını biz Mustafa bəy Topçubaşov kimi adamların şəxsiyyətində görürük, bunu dünya da görür".***

Bu sətirləri oxuyarkən düşünürsən ki, ümummilli liderin AMEA-nın fəaliyyətinə və M.Topçubaşov yaradıcılığına, onun şəxsiyyətinə verdiyi qiymətdən dəyərli bir qiymət tapmaq mümkün deyildir və bu böyük alimə, eləcə də AMEA-ya ən yüksək qiyməti məhz, dahi Heydər Əliyev veribdir.

Onu da qeyd etmək lazımdır ki, bu il AMEA-nın prezidenti akademik Akif Əlizadənin layihəsi əsasında AMEA-nın ilk təsisçilərinin hər biri haqqında ayrıca kitab çap olunması nəzərdə tutulub və bu kitablar artıq hazırlanaraq nəşriyyata təhvil verilib ki, bu da 15 nəfər təsisçinin, o cümlədən akademik M.Topçubaşovun xatirəsinə həsr olunmuş ən dəyərli töhfələrdən, ən monumental abidələrdəndir.

Azərbaycan cərrahiyyə elminin əsasını qoyan, onun nailiyyətlərini beynəlxalq aləmdə yorulmadan nümayiş etdirən, mənəvi təmizlik, təvazökarlıq rəmzinə çevrilən, insani keyfiyyətlərinə görə zəmanəmizin Hippokratı hesab edilən ictimai-siyasi xadim, akademik xatirəsi qədirbilən xalqımızın qəlbində həmişə yaşayacaqdır.

**akademik Əhliman ƏMİRASLANOV,**
**AMEA Biologiya və Tibb Elmləri Bölməsinin**
**akademik-katibi**